## Açığ məktub

İdarəmizə bu gün bir ağır məktub gəlib və məzmunundan belə anlaşılır ki, filan aşpaz şirədən çaxır alır... Pişirdigi xörəklərin ətini erməni ğəssabından, biz nə ğədər İravan xəbəri yazsaydığ özümüzə söz vermişdik ki, hər kəsin eybini aşkar yazağ. Ama bu dəfəyə baxınğ olmayacağ. Əgər ərmənidən ət alan aşpazların adlarıni aşkar yazsağ onların evləri yıxılar , daha heç kəs onlardan xörək pəməz və ələlxüsus Hacı Kazım çur keçıxanasına nə ğədər zərər dəgər. Çünki: bu aşpazların lap ağsaqqalı, namaz ğlanı o cür keçixanənin üstə dəgən açub və alverdə ğomşusi olan Hacı Kazım dükanıylədı. Əgər bu aşpaz dükanı bağlansa, çur keçiyə də zərər dəgər, buna görə biz hələlik aşpazlar barəsində gələn məktubı adiylə dərc etmirik ki, aşpazlara ziyan dəgməsin və bunlar gedə xətrinə innən sonqra olan əhvalati adıyla dərc etmiyəcəyik. Məgər yekə bir, iki , üç olunca o zaman bizim işimizdir. Hələ aşpazların cabirəsindəki kağızı gözləyirik, görək necə etdilər. Ya,yu, x.

## Ədəbiyyat

### Ana və qız

Sözümü mənim yaxşı dinlə ,qızım,
Sənə bir gözəl, nazlı ər tapmışam.
-Ana , getmirəm, getmirəm, getmirəm!
Özüm ki mənim elimli bir qızam,
Özümə də bir alim nər tapmışam
- Qzüm vermirəm, vermirəm, vermirəm!
- Bu çox pulludur, mallıdır, ballıdır,
Yağun salıbdır, şivə saqqallıdır.
- Ana ,uymaram ,uymaram, uymaram!
Məktəb görübdür mənim sevdiyim,



Həkimdir, təbibdir, qıraxmallıdır,
- Qızım, qoymaram, qoymaram, qoymaram!
Gərək hacı olsun sonra hökmən nər,
İmanlı və mömindir Hacı Səfər
- Ana, bılmərəm, bilmərəm, bilmərəm!
O hər gündə beş dəfə arvad döğər.
O, çox canlıdır zəyi kimi nərə zər
O nərə getmirəm, getmirəm, getmirəm!
- Qızım, məktəbə getməmiş sən hələ,
Yüzünmə gəlməzidin belə
Necə bilmədim, bilmədim, bilmədim...
Gedən vaxt səni qoymayam məktəbə
Hələ bu dilə bax, dilə bax dilə!
- Ana, neylədim? Neylədim? Neylədim? Neylədim?
Şəriətdə zor ilə getmək ərə
Əgər varsa, söylə bir kərə.
Anam madərim! Madərim ! Madərim!
- Qərəz sən məgər degilsən, qızım,
Qalaydı görüm məktəbin andıra.
Yazığ doxtərim, doxtərim.
Çıxıb ağıldan lap olub kafirə.
- Nə etdim ki? Çıxdım , ana, şəriətdən,
Özümlə degil, sevmirəm, sevmirəm!...
- Məni eylədin sanki bəxti qarə
Daha imdidən sonqura nə sən, nə mən.
Özün bil, daha getmə heç, getmə heç.

**Şeytan**

## LAL, KAR, yaxud LAT və LÜT

Necə ki, hər bır sadə olmuş insana məlumdur ki, hər millətın əlifbasında hər bir hərfdən bir dənə vardır. Məgər inki, bircə Fransuz və İngilisdə 2-ci (V) vardır ki, birinə (v ) və digərinə ( v yo) deyırlər: xəyalıma gələn öz əlifbamıza, yəni

müsəlman əlifbasına ki, bu əlifbada hər hərifdən yalnız bir dənədir. Yəni hürufatımızın nöqsanı çoxdur. Bu hərflər ilə yazıb-oxumaq çox müşküldür. Yəni bunu bir mən demirəm. Hamı ümumən uruslar , hətta bir para əqli nəğş müsəlmanlar da təsdiğ edir ki, müsəlman hürufatiylə iş görülməz!. Dilimizin eyni sövti-ləhcəmizin şivəsi gözlə ki, məhv olar. Qərəz, bizim bu hürufatımızın üstyndə çox böyük davadır, hələ indi necə ola, keçmişlərdə Mırzə Fətəli Axundov bu bəd bnanı ğoyanda elə bu çalhaçal var, var, var. Ama çox şükür ki, heç eylə bir ədib çıxmayıbdır ki, bizim bir (v) mzı 3 eyləsin . Müxtəsəri ki, qədim vaxtlarda bizim hürufatın barəsində genə bir böyük mübahisə əmələ gəlmiş ki, bir ədib-şair millətlərilə mübahisə edərkən bizim hürufatımızın kamil bir hürufat olduğini nişan vermək üçün (m)hərfini götürüb (lt)n başına yapışdurub hərf(ən) şəkli əmələ gətürdü ki, o da olsun müsəlman, yəni ğeyrətli, şücaətli, səxavətli, elm, fəzl bir tayfa ki, o zamandan bizim hürufat alğışlanıb. Bu günə kimi yaşayıb. Ama bu neçə illərdir ki, genə tazədən hürufat odur ki, oni yazmağla heç yoxdan bir şey əmələ gəlsün... allaha şükür keçən gün bu barədə yenidən açılmış bir mübahisə məclisində bunun da isbatını gördüm ki(bi nam) adlı bir ədib (LA) ki ərəbdə yuxa deyirlər ki, heç vücudi olmasa bən həmin millətin başındakı (m)ni götürüb(LA)nın başına yapışdırdı, oldu(molla), yəni dolu, yaxud Hacı Mırzə Həsən Ağa müctehid və Hacı Mırzə Kazım Ağa İmam cəmi əziz oğlanları ilə yainki, Ğubada molla yava və ya İrəvanda (Əbulla məsələ), Arıx Ğəzər, (molla eynək), nağalza qörün, xaxanalza qoruyun, satan və əyrilən mənim bunlarda işim yox və bu hürufat ki yarayırığ; heç bir ədibə məsləhət görmürəm ki, bu barədə bir söz yazsun ki, çox da gözəl hürufatımız var. Ama millətin(M )ni götürüb(La)dən bir molla yapan cənab xəbəri olmadı ki, genə millət nət ğaldı.

**Həpəıd**



## Axrtar

**İttifaği səbəblərdən tulantı bu nömrə vaxtından gec nəşr edildi.**

## "Lək-lək" can verir

Ay cocuğlar, gəlin bir az danışağ,
Tanış olağ , gəzək, gülək, danışağ.
Istəmərəm sizi mən ğəmgin görəm,
Ona görə istəyirəm güldürmək.
Mən hacı lək-ləkəm , haca getmişəm,
Göğdən uçub daha uca getmişəm.
Yalan demək, yaman demək bilmirəm,
Xalqa azar vermirəm, incitmirəm,
Hacı lək-ləkəm var uzun dimdiyim,
Ilan-qurbağadır tutub yedigim.
Bir yerə yığılsa əgər otuz qaz,
Mənim kimi uzun boğazı olmaz.
Neşə ki qış idi, çovğun getmişdim,
Uzaq şəhərlərə mənzil etmişdim.
Yaz açılıb, indi yenə gəlmişəm ,
Uca ağaclarda yuva tikmişəm.
Hər sabah, hər axşam vaxtı ahəstə,
Heç kəs bilməz durram bir qıçam üstə.
Dimdiyimi çallam birdən taqhataq,
Kəndə küy salaram onda şaqhaşaq.
Çünki mən hacıydım, özüm də mömün.
Xəyalıma şanı gəldi beylə bir gün,
Dedim öz yoldaşım hacı lək-ləkə,
Gəl kömək eylə bu bacı lək-ləkə.
Irəvanda bir məcmuə çıxarağ,
Hamı xalqı doğru yola çağırağ.

Adam öldürəni yazıb pisləyək,
Öz gözünə ğara sürtüb hisləyək.
Adam öldürməklən axır yamandır,
Yazıxdırlar, axır onlar da candır.
Bir pıçax adamın əlin kəsəndə,
Tağət qalmır onda canda, bədəndə.
Inciyir, sızlayır adamın canı,
Rəngi qaçar axsa bir misqal qanı.
Birisini öldürmək əgər istəsən,
Öldürməzsən bir az əgər düşünsən.
Əgər cavandırsa, anası ağlar,
Bacısı sızıldar, atası ağlar.
Əgər böyük olsa o ölən adam,
Öyündə olacağ bir böyük matəm.
Yetim qalar "Sadiği", həm "Səfəri",
Olmaz üstlərində ata nəzəri.
Oxumağdan, məktəbdən məhrum olar ,
Küçələri veyil-veyil gəzıb dolanar.
Heç bir işi dutmaz o cocuğ doğru,
Onda olar ya yol kəsən, ya oğru.
Şərab ıçənlərin qulağın burağ,
Şərab şüşəsini bir-bır sındıraq.
Şəriətdə çünki şərab haramdır,
Ələlxüsus ki, cana çox zıyandır.
Bır adam kı, gedıb ıçir, keflənir,
Küçələrdə səmə-səmə veyllənir.
Gəlib-gedənlərə yaman söz deyir,
Özün xalq içində bihörmət edir.
Qumarbaza çox eyləyək məzəmmət,
Bu pis işə bəlkə etməsin adət.
Aparıb var-yoxun uduzdurmasın,
Əyalını evdə ac-suz qoymasın
Uduzduğu pulu versın libasa ,



Aparsın, geydirsin oğlu Abbasa.
Aparsın məktəbə, qoysun, oxusun,
Oğlu təhsil edib bir alim olsun.
Tiryək çəkənlərın pisliyin yazaq ,
Onların eybini birbəbir açağ.
Tiryək onlara bir görün neyləmiş,
Can əriyib qalıb qupquru qəmiş.
Nə qolda qüvvət bar, nə canda şirə,
Hamısının gözü düşüb çuxura.
Yüzlərinə baxan yəqin irgənər,
Rəhimi gəlir, ona qoçu söylənir.
O kəslər ki, olub sahibi dövlət ,
Istədik onları edək məzəmmət.
Yoxsula,fağıraəl dutsun onlar,
Yetim uşağları oxutsun onlar.
O bir başa hər ağ dolayanlar,
Adlarını axund, molla qoyanlar.
Altı şaha kəbin pulu almaq üçün ,
Əlından kəsməsin gündə yüz kəbin.
Yoldaşım Hacı Lək-lək, dedim sözümü.
Dübarə yüzinisə dikdüm gözümü.
Bir ah çəkib dedim, o sahibi Lək-lək.
Çox gözəl söylədin , ay bacı Lək-lək.
Əgər biz bir belə ayığ baş qatsaq,
Etsən çətinliyi olar , toy ansan,
Çaxır içən , yol kəsən , tiryək çəkən.
Xəsis, dövlətli: hamı adam etdirən.
Hamısı tazə işindən əl çəkən bunlar,
Qumarbazlar xamı oynamaz qumar.
Onda hər kəs öz əynini düşünər,
Peşiman olub öz işindən əl çəkər.
Mollalar bir hədyan, yalan söyləməz.
Gözləyiriz müftəni, tələb eyləməz.

Hamı millət onda verər əl-ələ,
Aralıqda bir lək gəlir həsulə.
Müsəlmanıq, indi olar həğiği
Gözün açıb millət tapar tərəqqi,
Onda olmaz bizdə nə yoxsul, nə ac.
Heç kim daha olmaz çörəgə möhtac.
Bizdən olar razı Allah, Peyğəmbər,
Camaət də bizə təğidır eylər.
Bu iş eylə ki, gördük məsləhət,
Mətbuata çıxarmağa eylədik qeyrət.
Çox zəhmətiylə taa ixtiyar aldıq,
Lək-Lək adlı bir məcmuə çıxardıq.
Bütün bizi düşmən oldu cəmaət,
Harda gördülərsə etdilər nəshət.
Çaxır içən, adam kəsən, dam dələn,
Tiryək çəkən, qaz-baz oldu düşmən.
Burunladı bizı əyan, ağalar.
Təpik atdı bizə qırçı bu qədər
Yalançıq haymalı kafir ad qoydu.
Qara cəmaətdə o nəslərə uydu.
Xanlar, bəylər, ümmətimiz atılmaq.
Qaldı dedilər, həm qışqırıq, paslanmaq
Qərəz məcmuəmiz yaşadı, çoxaldı.
Borcumuz gəldikcə artdı-çoxaldı.
Lək-lək naxoşlayıb qızdırma tapdı,
Zəmidən çıxammadı, palçığa batdı.
Daha Lək-lək şağildəməğ bilmədi,
Qanadı yanına düşdü, titrədi.
Deyirdi ki, sallandı bu yerlər əkindi,
Bir qanadı azaldı, biri gödəldi.
Naxoşladı yazığ zəmidə qaldı,
Vayhavay naləsi göyə ucaldı.
Zəyiflədi, daha qalmadı taqət,



Ilan --qurbağa dutmağa etmədi cürət.
Qanadı bulaşıb palçığa batdı,
Qurbağalar gəlib üstündə yatdı.
Lək-lək öldü, ay cocuğlar, lap,
Bugün, sabah nə olar ğalıb.
Nə yoluxan var yazığa, nə su verən,
Nə təbib aparan var, nə dərman veürən.
Lək-ləkin xətirni istəyirsiniz,
Ata, qardaş, qızdan xahiş ediniz.
Əfraf xuçlarından bir azca yüfsun,
Sylı 3 manat yarımdır Lək-lək yazdırsın.
Oxumalı, gülməli məcmuədir,
Oxumasaniz da adama fayda verər.
Eləki müştəri oldi alanız,
Əfşaliki saxladar sizin dövrünüz.
Təbıb gələr lək-ləkə dərman verər,
Canə gəlib Lək-lək yenə dirilər.
Ondan sonra sizin üçün ayda bir
Lək-lək sizə bir hədiyyə göndərər.
Oxuyub göndərsəniz bəhrə bularsınız,
Oxumağa huş edib alim olarsınız.
Çalışan Lək-lək dirilib şağğıldasın,
Keyni maz olub gülsün, ğağıldasın.

**Lək-lək.**

**Müdir və naşirlər**: Mirməhəmməd Mirfətullayev və
Cabbar Əsgərzadə (Aciz)

## Elan

Bununla məlum edirəm ki, mən keçən may ayında (İrəvan islam dram şirkəti) qəzalığından və müdirliğindən xaric olmuşam. Mənim bu şirkət iylə bəd heç bir əlaqəm yoxdur.

Əli Hacızeynalabdinzadə(Təhvil)

## Elan

**İstanbulda hər on gündə nəşr olunan elmi , ədəbi və məsmur "Şahbal"məcmuəsi əcnəbi məmləkətlərə yeki: 10 manat 24 nüsxə və altı aylığı 5 manat 12 nüsxədən ibarət. Xahişmənd olanlar bu adresə rcuh buyursunlar. (İstanbulda iki pustxana ğarşısında Fərəx Bəy xanda nömr 9 , 10, 12) . Bu məcmuəyə nəhayət mətin bir məcmuəyə olub və hər kəscə ğiraəti arzu edilər. Dərcə nəfisdir, fayda bərdar olmağ üçün abunə hər kəsə tövsiyə ediriz**

**İrəvan, "Luyis" mətbəəsi.**

## Elan

Erməni dilində yeni nəşr olan "Nor mamul" qəzetəsi bu gündən elan edir ki, yenidən dərc edəcək, elan vərəqəsi Rusiyanın hər yerindən elan qəbul edir; bu vərəqə Rusiyanın hər nöqtəsində pulsuz paylanacaq. Elan dərc etdirən cənablar aşağıdakı adresə rücux vursunlar.

Elan qiyməti barəsində "Nor mamul" idarəsi ilə xüsusi danışmalıdır.

Kamal ehtiram ilə "Nor mamul" idarəsi.

Ünvan: İrəvan, "Nor mamul" redaksiyası.

## Elan

Bu ğəzet "**Sədayi Türküstan**" imdilik hər həftədə iki dəfə nəşr edilir. Ədəbi, iqtisadi, fənni və məişəti türkcə ceridədir.



Rusiyada
12 aylıq 4 manat.
6 aylıa 2 manat 50 qəpik.
3 aylıq 1 manat 50 qəpik.
Müsəlman xarici üçün
12 aylıq 6 manat.
6 aylıqı 3 manat 50 qəpik.
Adres :Taşkent. Romanovskaya 16, "**Sədayi Türküstan**" redaksiyası. Telefon No 537.

# 17 Iyun 1914-cü il, ŞƏNBƏ, No 11.

**Lək-lək türk dilində həftəlik məzhəkəli məcmuədir.**
**Hər nüsxəsi 7 qəpikdir.**

## Mindəricat



**Mərv şəhərində Əhmədliyə məktəbində müəllimlik edən, haq sözü düz danışan və doğru söz üstə Mərv şəhərinin politsiyasında ( 7 fevralda**

**) 1914-cü ildə bir çəkməsiylən iranlı tərəfindən ğətl olunan şəhid Yusif Heydərzadənin təsviridir.**



Yusif İrəvan mahalında Qəmərli kəndində təvəllüd tapıb.9-10 yaşlarında kənd məktəblərində və sonralar fürsət bulduqca orda-burda, bəzən müəllimlərdən dərs almağla məşğul olurmuş.Və sonralar heç bir tərəfdən müavinət görə bilməyib və təhsildən məhrum qalacağını və axırı talaşından bir heç bir fayda hasil olmayacağını düşünüb və nəhayət tərəqqiyə mayıl olduğu üçün 25, 27 yaşlarında İrəvana gəlib, bir-iki il müddətində dolanıb. Əğibət burada da gecə bir iş bula bilməyib, Mərv şəhərinə getmişdir və bir neçə illər idi ki, Mərv şəhərində idi.Və ara-sıra Mərv əhvəlatından (İqbal) cəridəsində məqalələri görünməkdə idi. Mərv əhlinin həyat və məişətlərindən, bir çox vaxtı məktəb və mariflərindən bəhs edirdi.Və bu sonku ildə camaat tərəfindən açılmış Əhmədliyə məktəbində müəllim olşmuş və həmişə cocukların milli hirslərini artırmaqda səy edib. Cocuklara xətbə və nəğmələr əzbərlədib, gahdan bir teatrolarda və cəmiyyətlərdə meydana çıxardardı. Genə bir gün uşaqlara camaatın halından bəhs edən bir nitğ, bir nəğmə öyrədib teatroda oxutdurub və camaat tərəfindən alqışlanır.Və



bu sonki nifğ məharəti məktəbinə daxil olub və bir nitğidə də bəzi əyanların xeyir işlərdə səhləkarlıq etməsi aklaşdığı üçün əhli fəsadın həmtiyyətinə səfişımadiğindan yuxarıdə ərz olunan kimi Mərv polisiyasında şəhid edilmişdir..., Allah rəhmət eləsin!

Ancaq burada hər bir əməl vicdana müvafiq olacaq. Bir füğirə vardırsa, o da Mərv mollalarinin mərhumə namaz qılmaları və kafirməş deyə bunun nəşini yerdə qoymalarıdır ki, sünni qardaşlarımızdan ğəlüb bu camiyə namaz qılıb və dəfinnə məşğul olmuşlar.

Mərhumun böylecə tərəğği və maarif yolunda haqq danışdığı və təğdiri əvsunində öldürülüb və mollalar da namazina gəlməyib, bu müsəlman oğlu müsəlmana nahaqdan kafir deyib və təqqir etdiklərinə görə idarəmiz tərəfindən mərhumun həğ sözü məhrərəgi və səyi ehtiramına qədrdanlıq təriğiylə təşviri alınub, məcmuəmiz vasitəsilə qarelərə təqdim olundu.

### Lək-ləkə

Ay kişi ! Lək-lək, bunlar insandır,
Tanrı sevən kimsə, müsəlmandılar.
Hacıdılar, bir çoxu əyandılar,
Bir azı bəylər, bir azı xandılar.
Bir çoxisi yırtıcı aslandılar.
Ay biləsən ki, nə gözəl candılar.

Bu xalq, bu millət kimi insan sevən,
Məktəb, danış, ürfan sevən,

Fəğirnəvaz, xeyir və ehsan sevən,
Əkşəri yəni mollayı oğlan sevən.
Sadələrə bir çoxi qurbandılar,
Ay biləsən ki, nə gözəl candılar.

Pul yerinə məktəb üçün can verir,
Müəllim, ruzə pirə ehsan verir,
Xəzinəçi ,məcmuəçiyə yan verir.
Nəşir bə meyxanəyə hər an verir.
Mədrəsəyə, məktəbə düşməndilər,
Şərh sevən sahib imandılar.

Cümlə tərəqqi işinə bazdilər,
Yəni içillər və ğumarbazdılar,
Tiryekidirlər və kefi sazdılar,
Qırmızı saqqal və başı dazdılar.
Sən demə bielm və nadandılar,
Cümlə ağazadə və əyandılar.

Lal ol, otur rahət! Utan bir kərə!
Yekxanəsin az dolaş , ay heyvərə!
Bax qoçidə peştüa, həm xənçərə,
Olmaya birdən deyəsən şəyip yerə,
Bil ki, bular Rüstəm dastandılar!
Ay biləsən ki, nə gözəl candılar.

Məndən əzizim, sənə olsun bu pinə,
Arifə, inliligetə çox olmaz binə!
Bunlar atar bu yetinə bir gün kəmənd,



Kəs səsini, dinmə, danışma həpənd.
Onda görəsən ki, alovlandılar,
Cümlə durub üstünə hoppandılar.

Ay! ..sənə nə ğızlərə tullandılar,
Keflənərək bağlara fırlandılar.
Varsa əgər insafın eylə nəzər,
(Şorta)lərə bax! Nə gözəl candılar,
Huri ğılmandı ____ ruh və reyhandılar.
Neyləsin axır bular, insaf eylə,
Hər birisi bir cavan oğlandılar,
Mədən ərfandılar,
Sahibi zamandılar.
Ay biləsən ki, nə gözəl candılar.

**Şeytan.**

## SİYASƏT ALƏMİNDƏN

### Dövlət dumasında Papacanovun nitqi

Hazarət oni siz yaxşı bilirsiniz ki, osmanlıdakı ermənilərin halı çox-çox pisdir. Axır onlar bizim axperlərimizdirlər!. Ruset dövlətinin qeyri-rəsmi qoşunlarıdırlar!. Və həqiqi oğlanlarıdırlar. Axı onu siz yaxşı bilirsiniz ki, onların Rus-Osmanlı sərhədlərində olmaları hərbi nöqteyi-nəzərindən nə qədər əhəmiyyətlidir. Onu siz dəxi bilirsiniz ki, qəlbimdə çox-çox fikirlər var ki, "saman altından su yeritmək nöqteyi-nəzərindən" bu qərsdən danışılmışı lazım deyildir.

Xəyalınıza bu gəlməsin ki, ermənilər ayrı bir fikirdə vardırlar, yox! And olsun "Pruşkeviç"in və cəmi bu əqidədə olan şəxslərin başınə. Mən ayrı bir şeyi demək istəmirəm. Lakin Rusya dövləti gərək Osmanlı dostluqlarına inanmasın, çünki bu qırmızı fəsliləri məndən yaxşı tanıyan yoxdur. Bunlar asiyalıdırlar. Bunların əvvəlimci hənirləri adam aldatmağdır. Mən tanıyıram. Bunları mən tanıyıram buları... (Pruşkeviç )və Melikov yerlərindən atılub Rusiyanın həğiği övladı Babadxanovi o qədər öpürlər ki, beçarə dəsmalını çığarıb yüzünü tez-tez silir).Cəfərovun nitği – həzran, mənim əqidəmcə Babacanov bu qərşidən ayrı bir söz demədi. Fəqət bunu söylədi ki, Ay ğuşını, nuli, az Rusiyə sən eylə bilmə ki, Anadolida olan sənin həqiqi oğulların ermənilər səni yadından çıxarıblar. Xatircəhm ol Rusiyaya (Loris Melikov) və (Ter Qukasov) lar verib. Ermənilər indi də (Nuri Paşa)lar hazır ediblər...Lakin mənim əqidəmcə, ağalar, bu kərsi xitabətdən cənab vəzir neçəki buyurdu. Osmanlılarilə rusların arasında səmimi dostluğ əmələ gəlməgə başlıyur; və oni siz yəqin edin. Bu ğırmızı fəslilər ilə dost olduğumuz zaman həm silah vəğtində mənfəət və həm dava vaxtında kömək görə bilərik. Çünki, hərçənd ki, osmanlılar da imdi o ğədər ğua toxdur, lakin: oni dəxi biliniz ki, ixtilaf məsk trazusinin hansı gözündə osmanlılar olsa, o tərəfin ümumi yorupa "Tula urma"oyunundan ğalxub çıxacağı yəğindi.



Boğazlar məsələsinə gəldikdə oni bilin ki, dostun ğapısı dosta həmişə açığ olar(Alqışlar) (Pruşkeviş Melikov və Babacanovun burunları o ğədər uzanır ki, Cəfərova toxundixdə karsı xitabətdən büdrəyüb az ğala yıxılsın).

**Dərviş nəbəki.**

## Teleqraf xəbərləri

**Həmədan**- Bu il həştad zəmi həşiş artığ əkmişlər ki, hasil olan tiryəkin mədaxili (İbn Əli Sina)nın qəbrində nişangahının ətrafına bir həsar çəksinlər. Ancağ Həmədanın kəsif küçələrinin tozundan yel əsərkən bu mömünin burnuna dolub təksəbr gəldi , hamı əl saxladı.

Sonra Nəcəfdən, Təbrizdən, Səlmasdan, Xoydan, Mərənddən bəzi müctehidlərdən vəht ğəbəli molla yavadan da böylə bir teleqraf alindi ki, Xorasanda, Təbrizdə, Azərbaycanda, Ərəğistanın çox yerlərində tiryakilər bu il vərşikəst çıxdığlari üçün bu il hasil olan tiryəki onlara ehsan edüb, gələn il yuxarıdakı əmələ mübaşir olsunlar.

**Həmədan**- Cavan şahın tacgüzərlığına hazır olmağ üçün şcah altünlar istixarə etməkdədir. Əgər istixarə yol versə neçə min suvari Tehranə gedəcək; ama bəd nəzər dəkməmək üçün Hacı Mirzə Həsənin bir nəzr duası olub. Golinə bağlamağ istəyür ki, bu gedəndə calalına göz dəgməsin . Hacı Səməd Xan

ğayıdanacan cəmaətin nöxtasini Hacı Mirzə Həsən heç oturmamasını imdidən vədəydir.

## Ordubad

Sənət məktəbləri açıldı; kasıb uşağlarından başğa heç kəs götürülmüyəcəkdir. Sənət məktəbinə daxil olan kasib uşağlari gündə 6 qəpikdən 8 qəpikə ğədər muzd alacağdırlar. Məktəblər hər barama və ipək vəğti açılacağdırlar. Məktəbdə oğuyan uşağların rəsmi libasları; papağ, yalın olmağ, başını ğapuf, kəsif dəstimal bağlamağ, yırtığ tuman geymək olacağdır.

Məktəbdə oxunan elmlər; ocağ yandırmağ, su daşımağ, hammallığ etmək, barama işində işləmək. Rusetdə də olan əcnəbilərin məktəblər ilə bu məktəbin fərği odur ki, onlar yay günü tətil edür. Ama bu 3 ay işləyib 9 ay tətil edəcəkdir. Allah dövlətlilərimizə bu tövr işlərin cəzasını versün. **Siyasi**

## Şəhər aralığında

Bu günlər şəhər möhtəbərlərindən birinin evində Naxçıvandan gəlmə bir alimin şərəfinə qəşidə edilmiş ziyafət süfrəsinə yerli böyük üləma və mollalardan cazir bulundiğləri sırada yalahatmə olub ğurtarandan sonra ğəlyan xoriltisinin həvısiylə şirin söhbətlər əsnasında tyatro əleyhinə böyük nifrətlər izhar edildi. Həğiğət əlhən böyük nemətləri belə ürfanpərvər mollalara halal olsun. Hansı ki, mübahisədən hər



yerdə edib bütün teatro qapılarını bağlı qoyarlar... Maşallah, urraa, urraa .

## Bakı , xırım-xırda işlər

May ayının əvvələrində Bakıda rus və müsəlman məktəblədində olan müsəlman müəllim ğardaşların arasında bir "Şamaxılı" və "Qarabağlı" söhbəti düşmüşdü. Mayın ortalarında bu söhbət elə bir ğızmış hala gəlmişdi ki, hər gün Quba meydanında bu iki müəllim dəstəsinin çarpışması gözlənirdi... Ama heyif, nədənsə çarpışma –filan olmayıb, göstləmələr heçə getdi. Çırpışma- flan olmadı.

Bakının dəryakəxani dairlərində belə deyişmələr ki, güya müəllimlər bu məsələni payıza kimi taxirə salıblar. Aməd ki, bu tazə (teatro) üsul müəllimlər arasında artığ intişar tapıb. Gələn ildən bu müəllimlərin dəst provodələri, balaca, məsum şagirdlərin dəxidə ədəbli və tərbiyəli olmalarına baxış olunacaqdır.Allah öz birliyi xatirinə bu işin də axırını xeyr eyləsin.

Müsəlman teatrı alış-verişçiləri (bəzi vaxt artistlər də demək olar) yay fəsli girdiyinə görə bu fəallarından başğa hərirlərini, yəni başlarını, canlarını da ğirtdirub Qafqazın dəkəşə yaylaqlarında teyatrolar göstərib, alış-veriş edib, bundan əlavə şənlənib və ümidimiz budur ki, payız fəsli Bakıya qayıdanda başları, canları ətli qalıb cəmaətin qanını daha da hörmət ilə soracaqlar və bundan əlavə həmin bu teatro

tacirləri Bakıdakı tazə işçilərə payızda oynamamağından ötrü bu ali opera və liberetto yazmaq zakazları vermişlər.

Bu saat yazıçılar bərk işdədirlər, maskalarını qorumağa məcəlləri yoxdur. Allah axırını xeyr eyləsin.

## TAQQILTI

Biz dedik suxtə təhsil olur eylədiz gün
Bir gecə oxur, yazı bilmir oğlanlarımız,
Bilməzik ki, yalnız rusca təhsil eyləyib
(Ğavalir) tutmağa hazırlanacaq ğızlarımız.

Şeytan.

## HIKMƏTLI SÖZLƏR.

Bir bakılı olub aşna saxlamasan eylə,
Bil ki, Ordubadda oturub həna yaxmırsan.

****

Artist və ya yazıçı olub özünü hər yerdə tərifləməkdən yəqin ki, səndə şübhə var.

****

Özün ki, nə qədər xaricilərə oxşayırsan, o qədər yaxşıdır. Dilini dəyişənlər də lap gözəldir.

***Cırtdan.***



## Naqqalın əkrinə hədiyyə.

Döz bir otaqda dutmuşidin ğəm əzasını
Söz eylədirdik ordaca millət bəlasını.
Gösrətdi bu xanım sənə öz metrqasını,
Huşin dağıldımı görəli əşvəhasını.
Qu gələn ötürdü çəkdimi? Qəmbər cəfasını.

Hərdəm deyirdik, ay ki, əğyar bilməsin,
Bu hali bir nəfər bura ki, tar bilməsin.
Ariflər olmasın da xəbərdar, bilməsin.
Bu məclis azadə nələr var bilməsin.
Ruzəpəzən yurəkdəki zövğ zəfasını.

Ağlatmağ orda ğızları söz yox suvay idi.
Rövzən odur ki, "rast", "humayun", "rəhab"idi.
Tağət yoxumdur, görmə ki, böyrək kəvabidi,
Başlarda al-yaşıl, mari, əlvan hicabidi.
Cadralar altda eylədik hər ədasını.

Bu fərdiylə təmami səynən başını ğatub
Gah ağladıb və gah əmammənin yerə atıb,
Zəzuvan, cənti olara müftecə satıb.
Çadra şəb alitdə fəsildən hiss eylədik bir nəfər atub
Əfşani babli, həmi xeyr olunsa siyani.

***Hərif***

## Təshih

Əvvəlki nömrəmizdə ikiminci səhifədə Yusif Heydərzadənin tarixi belədir: 12 fevral 1914. altıncı səhifədə hikmətli sözlərdə ikinci sətrdə (Ordubad) (r)si qalmış, beşinci sətirdə(ğalusnu fəz) yerinə ğalufsiz yazılmış. Təhsih edib böyük xətlərlə ğarelərı zəhmət verməmizdən üzr istəyirik.

..........

**Müdir və naşirlər**: Mirməhəmməd Mirfətullayev və Cabbar Əsgərzadə (Aciz)

## Elan

Bununla məlum edirəm ki, mən keçən may ayında (İrəvan islam dram şirkəti) qəzalığından və müdirliğindən xaric olmuşam. Mənim bu şirkət iylə bəd heç bir əlaqəm yoxdur.

Əli Hacızeynalabdinzadə(Təhvil)

## Elan

İstanbulda hər on gündə nəşr olunan elmi , ədəbi və məsmur "Şahbal"məcmuəsi əcnəbi məmləkətlərə yeki: 10 manat 24 nüsxə və altı aylığı 5 manat 12 nüsxədən ibarət. Xahişmənd olanlar bu adresə rcuh buyursunlar. (İstanbulda iki pustxana ğarşısında Fərəx Bəy xanda nömr 9 , 10, 12) . Bu məcmuəyə nəhayət mətin bir məcmuəyə olub və hər kəsə ğiraətı arzu edilər. Dərcə nəfisdir, fayda bərdar olmağ üçün abunə hər kəsə tövsiyə ediriz

**İrəvan, "Luyis" mətbəəsi.**



## Elan

Erməni dilində yeni nəşr olan "Nor mamul" qəzetəsi bugündən elan edir ki, yenidən dərc edəcək, elan vərəqəsi Rusiyanın hər yerindən elan qəbul edir; bu vərəqə Rusiyanın hər nöqtəsində pulsuz paylanacaq. Elan dərc etdirən cənablar aşağıdakı adresə rücux vursunlar.

Elan qiyməti barəsində "Nor mamul" idarəsi ilə xüsusi danışmalıdır.

Kamal ehtiram ilə "Nor mamul" idarəsi

Ünvan: İrəvan, "Nor mamul" redaksiyası

## Elan

Bu ğəzet **"Sədayi Türküstan"** imdilik hər həftədə iki dəfə nəşr edilir. ədəbi, iqtisadi, fənni və məişətı türkcə cəridədir.

Rusiyada
13 aylıq 4 manat.
7 aylıa 2 manat 50 qəpik.
3 aylıq 1 manat 50 qəpik.
Müsəlman xarii üçün
12 aylıq 6 manat.
6 aylıqı 3 manat 50 qəpik.

Adres :Taşkent, Romanovskaya 16, **"Sədayi Türküstan"** redaksiyası. Telefon No 537.

**Типографія «Луйсъ» Эриванъ - Mətbəə "Luys" , İrəvan**

**30 IYUN 1914 cü il, ŞƏNBƏ , No 12.**
Lək-lək türk dilində həftəlik məzhəkəli məcmuədir.
Hər nüsxəsi 7 qəpikdir.

## Axtar

**Bu "Lək-lək" məcmuəsinin 12-ci nömrəsinin müdiri və naşirligindən bən də istefa vermişəm ;cavab gəlincəyə qədər mənim adım müdiriyyət təriğiyləmöğtən dərc edilir.**
**Mir Məhəmməd Mir Fətullayof.**

## Tanıtsuyu əlini veçir, yaxud Ehsanəli kişiyə müjdə

Şad ol kişi, sərtac müsəlman olur oğlun,
Məktəb qurtarır şanlı bir insan olur oğlun.
Cansız vətənin cisminə bir can olur oğlun,
Dərmansız olan millətə dərman olur oğlum.
Səd şükür ki, sahib ərfan olur oğlun

Heç olmasa hazır eylə yüz əlli qalustuğ,
Məktəbdə ikən açığı ya oğlun oturub şuğ,
Pereçatğa, varatniklə, turusiyə çıkır zuğ,
Tans etməsə hər sutka pərişan olur oğlun.
Səd şükür ki, sahib ərfan olur oğlun



Fikir etmə ki, yoldan çıxarar oğlini "şurğa",
Oyna lala qalıblar da gecə təngu "mazurğa",
Arif nəyə lazimdir əgər bilməsə "pulğa",
Ki vals gedirkən "padaspaz"olur oğlun.
Səd şükür ki, sahib ərfan olur oğlun

Qəmçəkməki oğlun dolanırşəhərdəveyil-veyil,
"Sırğaçığa" gələ oynuya bilməz belə "ğadiril"
Sübhə kimi fırlar gecə bu itdən olan bil,
"Oynayarda" qutardıqda peşman olar oğlun.
Səd şükür ki, sahhib ərfan olur oğlun.

Oğlun ki qalıb bir belə ğəhmil kəmallığ,
Hər ğümə belə ğərğ açur canım, müsavad
Damalara təlim eyləyir, ovırə xəyavat,
Fəxrindir bu əlbəttə ki, neyşan olur oğlun,
Səd şükür ki, sahib ərfan olur oğlun.

Zallarda xuraman ------- bulvarda heyran,
"Roza"ya düşəndə mehman olur oğlun.
Qorxma qocalanda insan olur oğlun,
Səd şükür ki sahib ərfan olur oğlun.

*Hərdəmxəyal*

## Bunu kim bilmir ?

Yunanlar indi məmə yeyən uşaqlarını süddən kəsəndə cocuklarına məxsus yapadıkları çörəklərə də türk adı qoyub, cocuklara yedirtmək istəyirlər;

Və ögrətdikləri nəğmələri də öylə bir tərzdə yapublar ki, atalar dənizdən bir gəmi keçərkən içindəki adamlar bu nəğmələrin səsini eşidsələr, elə bilərlər ki, Yunanıstandan bir çox küçüklər İstanbula tərəf ağız-ağıza verib hürüyürlər. Bunu kim blmir ki, Yunan dövləti türkləri öz yurdlarından başlar pinə tapdıya-tapıya hicrətə məcbur edib, öz tərəfindən məbləğlər göndərib. Yunanları Yunanıstana çağırıb, türklərin yerinə doldurub.... və bir də buni kim bilmir ki, gündə bir misğal yalana, iftiraya min lopuğ verüb, türkləri də rusvay eləməgə, vəhşi adlandırmağa çaluşurlar ki, bizim ellik türklərin zülmündən qaçurlar. Hələ bəzi qəzetələr burda aşıb deyirlər ki: (bəs, əcaba qafqazdan və rusetin bəzi nöqtələrindən gələn bəzi mühacirlərin niyə bəs düz Salonikə doğru gəlib, ordaca sükunət edib yerləşirlər?.... Bunlardamı türklərin zamanında qaçurlar, yaxud bu baldırı açığların öz bijlikləridirmi? ). Burasını hər kəs bilir ki, Balkan davasından sonra bəzi vətənfruşlərin heyləsi səbəbinə yunanın gözü Türkiyəni almışdı və hər halda da istəyürdi ki, bir ğuş olub Ayasufiyanın hilalının yerinə bir xaç yapdırsın. Amma qanadsızlığından bürüşüb bir yerdə ğalmışdır... Deyirdi inşallah br gün olar ki, nəhəng gəmi Adriatik dənizindən cumub Dardaneldən keçib savahəli selə verib İstambuli batıraram...

Yunanlar bu xəyalpulovi çoxdan yeyirdilər. Daha bəzi siyasət dairələrində ğələm yürüdənlər, yunanların dava hazırlığı Türkiyə bəhriyəsinin qüvvətlənməsindən görməsünlər. Bizə ğalırsa Balkan davasından sonra da yunanlar öylə bu fikirdə varidilər, əgər yox idilərsə bəs o nə məbləğ dəstgahi idi ki, Türkiyədəki yunanları dəvət edib Yunanıstandaki türklərin də başlarına dögüb ğovurdular? Əgər bizdən soruşsanız dosti yunanlar Türkitədə görüb ğoymağ istəmirlər . Səbəbi də odur ki, bunlar özlərinin mütəşəkilliklərindən və vəhşətlərindən baxırdırlar, bilirlər ki, dava başlanarsa heç vaxt gərək Yunanıstanda olan türkləri pişürib kəbab eyləsünlər. Girov olsa bu da bir az çətin olur. Odur ki, (Qosa kəndə girməmiş yələli səni başlayır...) Türk dərid natutlərinin hamısı da saman altından nə su qavırsa burasından artığ xəbər verən görülmir.

Ğərəz sözüm bundadır ki, o ğədər bəhş ediləcək, bir məsələ yoxdur, buni hamu bilir ki, baldırı açığ yunanlar , eylə həmişə başlarından yekə ğoz ğırmağ istiyurlər, ama gövrək dəvəl mözmə türklərə buyurduğları kimi yunanlara da "balam, utan oturur yerinə". Deyəcəklərmi?!.... *Çağçağ*

## Az qaldı

Az ğaldı özi çavan afişanə yetişsün,
Hər güclü təpik vurmağə şəğanə yetişsün,

Min müjdğr əmfası hər yanə yetişsün,
Sevmən kişilər məscid qurana yetişsün.
Mollalarımız bir yeni dövranə yetişsün,
Yəni ki bular şəfrayə, ehsanə yetişsün.

Azadə olar bu göəl ayda hamı nəsvan,
Yekəsi geyinir tənlərinə camiiyə əlvan,
Yar-yoldaşını görmək üçün bir belə dövran
Çoxdandi göztlərdi bizim Xəccə, Tükəzban
Az qaldı Yetər, Fatimə Şəbistanə yetişsün,
Dərdləşmə ki, Tərlanə və Ceyranə yetişsün.

Az qaldı ki vaizlərimiz mətləbi bülsun,
Mömin kişilər məscid viranə yıfılsun,
Məscidə ğsurat cənan dövriğə ğoyulsun,
Həm vaiz, həm röüzə pəzən cibləri dolsun
Ağdan, ğaradan bollu cibişdanə yetişsin,
Mollaya şəfa, qüssə müsəlmanə yetişsün.

Az ğaldı ki, yerlərdə olarkən dəm iftar,
Ğızbsə Hacı Mösumn əlindən çıka zinhar,
Gopdan , şapalağdan edələr nalə uşağlar,
Paprus keyfinə dilxor olarkən Hacı Səttar,
Fəhşi, yamani dinə və imanə yetşsün.
Bullu götgi nazlu xatıncanə yetişsün.

Az qaldi salu çinaçi yğur bəxtur olsun,
Hər gündə beş-on putsu xeri bulği satılsun,
Bozbaşlı ğarinlər də pirujna ilə dolsun,



Süd, qəhvə, qoğal, şağalad da sbil olsun,
Hər kimsə ğərəz nəfmət olanə yetişsün,
Az qaldı "Orucluğ" ayı meydanə yetişsün.

*Məhkəmə Pişiyi*

## Tözit

Əvət hertsoğ Frants Ferdinantın belə vəhşiyanə ğətl olunmasi İranın siyasi dairələrində böyük bir svətajir bağışladığı kimi Əfğanıstan əmrinin dəxi ğüssələnməginə səbəb olmuşdur. Çünki, Müğəttul, Əfğanıstan siyasətinə müvafiğ bir siyasət yürütdügi kimi gahdan bir İranın dəxi tərəğği və talesini yuxuda görürdü. Ona görə də allah İran cəmaətinə scah əldölənin ədaləti haqqına səbr cəzil əta eyləsin, tainki ərfəhadulə məarfəndən bəhrəyab olub, Məhməd Əlinin gününə düşməsinlər.

Allah əmir əfğanında dırnağını bərk və kəlləsini sələmət eyləsün, yainki çulğandığı ənqayis turlarının arəsində oyan-buyana hərəkət edə bilüb nəfəs ala bilək.

Əllahi and verirəm Nasir Əlmalikin siyasətinə, səpihdarın əminliyinə, mərhum Kamal Paşanın ğeyrətinə, İmam Yahyanın insafına, Əmir Buxaranın fəaliyyətinə, ələlxüsusi İrəvan cəmiyyəti xeyriyəsinin tazə açdığı məktəb və ğiraətxanasına : mərakeşlilərə səbr və molla həfdədə dübarə yüz əlli övrət əta eyləsin. Amin !

***Dul toyuğ***

## GƏNCƏDƏN MƏKTUB

Cənab Lək-lək əmi, bilmirəm, bilirsən yazmırsan, ya bu nə günah işdir? Indi xalx yaylağa getdigi üçün Şah Abbas Meydanının ayağında dükançıların al-veri kəsilib, əlləri boşdur. Ancağ bekar vağtlari ğazet-jurnal oxuyanda kəsalətləri çoxalır: buna görə də kərsinin üstünə ignə nəsib eyləyiblər ki, kəlib-gedən həmşəriləri lütfən əqişdürüb o krislərə töksünlər, yainki bir an söhbət eyləsinlər. Çünki ignə ilə təkmində artığ əkəşmirlər və bunları da kəsalət basır.

Nə isə, hansı yazıx həmşərini əkişdirilərsə, iynə yanına batan kimi qalxır ayağa . Yazıx cavanlar müsahibsiz qalırlar, amma yenə bəd keçmir, az təfrih əmələ gəlir.

Bilmirəm niyə yazmırsan? (...) də (Tanya) xanım Gəncənin mötəbər cavanlarına süzənək medalı əta edib və gözəl cavanlarımız qiyamətə kimi xərc versinlər. Doğrudur, hər medal alan gərək bir az da pensiya alsun. Ama eşq medalı alan gərək xərc versin.

Bilmirəm, əmi, xəbər varmı? Yainki məcəlin olsa sən də bir gəlib bizim kəndin yaylağına gedəsən, görəsən , sizin yaylaxlarda çox ğumar oynanır, yoxsa bizim Hacı Kəndində?

Görəsən sizin cavanlar banka çox uduzur, yoxsa bizim, görəsən sizin cavanlar çox ceyran südü içir, yoxsa buranın? Bilmirəm niyə yazmırsan ? Bu nə



işdir? Indi ki, yazmırsan töğh edirəm bu neçə sətr şeyrləri yazasan.

Dkanşıların bekar çağ işidir,
Ignə oynatmağ alış-verişdir,
Görsən Gəncə içrə gözəl Nanyanı,
Medal verib, yola salıb neçə cavanı.
Ignə sanub, oynadaruğ iranlını, tatı
Meşələrdə eliyərik hazırmi busati.
Gəlib bircə, lək-lək əmi, bağıranın halına bax,
Qastindəki, meşədəki cənabların halına bax.

*Palas qulaz*

## HIKMƏTLI SÖZLƏR

Bacarsan dourət beş arvad al, ğoy mənfəəti çoxalsun.

Pulin oldi get ziyarətə, ğayıdanda ac ğalsan da, əybi yoxdur.

Əsni dəyanət ki, acından solmadı ona əsud binnət deməzlər, xeyli alıxmıs ki, müslman ola.

Mayasız alış-vsriş isləsən buğlarını qırxdırıb ariğbəst ol.

*Cırtdan*

## NAXÇIVAN

**Kələntərovun röyası.**

Bu gün ayın 18-də saət 11 radələrində Kələntərov cənabları bir qədər istirahət üçün yuxulamaq istəyib yatır. Aləmi röyada bir məclis müşahidə edir ki, o məclis tamamən elmə elə-belə məlumdur. Həti Mir Patəşir həzrətləri də o məclisdə hazırdır. Söhbət haradan gəlirsə Kələntərov həzrətlərimiz Pirtdaşix cənablarının meydanda nəzah vağe olur. Kələntərov yuxuda əlinə ğauzyur ki, Pirtdaşixi vursun. Birdən yuxudan ayılıb görür çarsuda qalmağaldır? Kələntərof deyir, ay uşax, nə qeyliğaldır?. Deyirlər çıx eşigə, gör nə var!

Çarsuya çıxdığda görür ğaradavay ağani aparır, a bala, nə olub? Deyirlər nə olacağ, ağa bir erməni balasına bir müxtəsər təklif edibdür, o kafır oğlu da ağanin neyğənbər övladi olduğunu bilməyub, gedib pristava sikayət edübdur.İndi ağəmiz Prtdaşiği uçastgayə aparırlar.

Mən indiyətək belə tez çin olan yuxu görməmişəm.



## ŞƏHƏR ARALIĞI

Yayın isti günləri başlayıb.Alver də kəsildiginə görə bəzi ticarzadələr(Zəngi) bufetində keyf eləməgi münasib görürlər.Çünki,orada həm pivənin butulğası 12 qəpikdir, həm də çimmək üçün gözəl uşağların hamısı ora gəlürlər. Həm ziyarət, həm də işrət. Banğurot çıxmağın da qorxusu yoxdur, allah kərimdir.

....

Rus-müsəlman məktəbi dörd yüz dörd nəfər kamalli uşağlar tamam edib, o saət da şəhadətnamə aldılar(və ən yekə dalzin...).

....

Aldığımız məlumata görə sabahlari cəmiyyət xeyriyə tərəfindən böyük bir giraətxanə açılacağ; iki minə yavx ğazetələr, bir o ğədər jurnal və iki milyon cild kitab xarici məmləkətlərdən yazub götürüblər.

....

Idarə- xəznədarın yaylağa getməgi olmasaydı daha da yaxşı olar idi.

## SANCI

**Təkfir edir insafları əvbab məyayim**
**Biçarələrin ğani iylə pisər olunca.**
**Zən etmə ki, bular çukuran cu cəfadan.**
**Aş kimi ğədr böhtanə xakişər olunca.**

***Mələk nağğal***

## BITMƏZ SÜTÜNLAR
## ŞƏBANI DAHA AXIRINCƏKI ƏMƏLI

Bu on gündə hər bir mömin kişi canini və palalarini , öy-eşiğini pak etməgi sənətdir. Məgər bir ağzını pak etməsün! Bu çox məkrufdir.

**Sual** – möminlər nə üçün gərək ağızlərini yumasınlar?

**Cavab** – çünki: bizim oruc dutan möminlərimiz çarsi-bazarda və iftar zamani evdə paprus kefinə ağızlarini ğoxutmağə məcburdular. Buna görə ki, bunlar böylə etməsələr, heç kəs yəğin etməz ki, bunlar orucdurlar. Ona görə ağız pağlamağ məsələsi şuval ayında həll olar.

....

Məşədiyar imdidən məscidlərdə paya dalında bir döşə keşə salıb, yerdə oturtmaları sənət mövğədədir.

**Sual** – nə üçün bəs, paya dalında ?

**Cavab** – çünki, sadələrilə xağ içində daşısalar, həm özləri, həm cəmiyyət boç ğalar.

## Tazə süfrə almağ vacibdir

**Sual** – bəlkə birinin ehsanı yoxdur? O da alsunmi?

**Cavab** - Əvət, bu süfrə yalanız ehsan sahibi üçün degil, bəlkə bütun müsəlmanlara məxsusdur ki, tazə süfrədə mollalara ehsan plovu verər və köhnə süfrəyə də məscidə gedəndə başmağlarini bükər. Genə vacib əməllərdəndir ki, hər kəs qulağına bir-iki misğal civə töküb kar olsun.

**Sual** - əcaba?

**Cavab** – Mollaların yasin və məkfir şağğiyyətləri onsuz da ürfani kar edəcək, ğabağca kar olsan, ğanin xarab olmaz. Və bir də ğalan əvvamlar da imdidən kar olsa, beyinləri mövhümatla dolmaz.

<u>**Bayğuş**</u>

## Axtar

Bəzi səbəblərə görə bir neçə nömrədən sonra daha "Lək-lək"məcmuəsi çıxmayıb və "Lək-lək" müştərilərinə yenidən nəşr ediləcək "Çınqı" namında məcmuə göndəriləcəkdir; möhtərəm mühərrirlərimiz və qarelərimiz həmin"Lək-lək" məcmuəsinin ğapanmasını nəşrimizin tənzilinə həmlə etməyib, belə ki, "Lək-lək" əvəzinə daha da mükəmməl bir surətdə çıxacağ . "Çınqi"məcmuəsinin nəfs kağız üzərində dərc edilib , daha parlaq və mükəmməl olmasını nəzərə almalıdırlar. Bu yeni nəşr olunan "Çınqı" Əli "Məhzun" Hacı Zeynəlabdinzadə və "Lək-lək"müdirlərindən Hacı Əsgərzadənin təht müdriyyətlərində olub, İrəvanın bir neçə maarifpərvər cavanlarının maddi və mənəvi köməklikləri ilə nəşr olunacağ. Ümum qarelərdən tövğh olunur ki, əgər "Çınqı" məcmuəsi nəşri bizdən asılı olmayan

səbəblərə görə bir neçə həftə taxir olunar isə səbrsizlik etməyib , bizləri məzur dutsunlar. "Lək-lək" elanını dərc edən, ğəzetələrdən tövğh olunur. Yenidən yazdığımız ğəzetlərlə "Çınqı" məcmuəsinin elanını versinlər.

Idarəmiz ilə muxabirə etmək istəyənlər və ələlxüsus möhtərəm müxbir və mühərrirlərimiz və pul göndərən müştərilərimiz və vəkillərimiz bu adresə rcuh etsünlər.

*İrəvan, "Lyus" mətbəəsi redaksiyası.*
*Müdir və naşirlər: M.Mirfətullayof və C. Əsgərzadə(Aciz)*

## Elan

İstanbulda hər on gündə nəşr olunan elmi , ədəbi və məsmur "Şahbal"məcmuəsi əcnəbi məmləkətlərə yeki: 10 manat 24 nüsxə və altı aylığı 5 manat 12 nüsxədən ibarət. Xahişmənd olanlar bu adresə rcuh buyursunlar. (İstanbulda iki pustxana ğarşısında Fərəx Bəy xanda nömr 9 , 10, 12) . Bu məcmuəyə nəhayət mətin bir məcmuəyə olub və hər kəscə ğiraəti arzu edilər. Dərcə nəfisdir, fayda bərdar olmağ üçün abunə hər kəsə tövsiyə ediriz

**İrəvan, "Luyis" mətbəəsi.**

## Elan

Peterburqda rus dilində dərc olunan həftəlik müsəlman qəzetəsi « Мусульманс кая Газета»

Illiyi 5 manat, yarım illiyi 3 manat. Irəvanda vəkil Əli Hacı Zeynəlabdinzadəyə rcuh olunsun abunə olmaği rusca bilən intiligentlərimizə tövsiyə edirik.



## Elan

Bu ğəzet "**Sədayi Türküstan**" imdilik hər həftədə iki dəfə nəşr edilir. Ədəbı, iqtisadi, fənnı və məişəti türkcə ceridədir.

Rusiyada
14 aylıq 4 manat.
8 aylığ 2 manat 50 qəpik.
3 aylıq 1 manat 50 qəpik.
Müsəlman xarici üçün
12 aylıq 6 manat.
6 aylıqı 3 manat 50 qəpik.

Adres :Taşkent, Romanovskaya 16, "**Sədayi Türküstan**" redaksiyası. Telefon No 537.

**Типографія «Луйсъ» Эриванъ - Mətbəə "Luys" , İrəvan**

..........

## Lüğət

Abdal – qədimdə dəvrişlərə verilən ad; türk soyu; dilənşi.

Aməd – gəlir, gəlmə; yetişmə, çatma.

Ayyaş- çox içki içən.

Azadə- sərbəst, hər qadağadan qurtulmuş.

Azami- ən çox, ən yüksək.

Ajar – təzə, köhnəlməmiş.

Baca -ocaqdakı tüstünun bayıra çıxarılması üçün evun damında açıq yer.

Bəkləmək – gözləmək; qorumaq, mühafizə etmək.

Bəlləmək –öyrənmək, əzbərləmək; xatırlamaq.

Bəsirət – gözüaçıqlıq, diqqətlilik.

Binəzir – misilsiz, əvəzsiz.

Bürhan – həqiqət, dəlil, sübut.

Cami – müsəlmanların ibadət üçün toplaşdıqları yer.
Çarık - göndən tikilən ayaqqabı.
Çarə - qurtuluş yolu
Çocuk – kiçik yaşda olan oğlan vəya qız.
Dağarcık- meşin torba.
Dayanıklı – sağlam, güclü, mətin.
Əfəl – bir iş görməyən.
Əkmək – çörək, qida; ruzi.
Əmir - Islam dövlətlərində bəy, başqan.
Əyan – aristokrat, zadəgan.
Əsnaf – siniflər, sənətkar, özəl sənətlə yaşayan.
Fasih – düzgün və açıq danışan.
Fəqir – yoxsulluq, ehtiyac.
Fiqih – fiqih alimi.
Fəzil - ləyaqətli, üstün, məziyyətli.
Fövrən – tələsik, dərhal.
Qarelər- oxucular.
Qəsb – zorla alma.
Qissə - hekayə, nağıl; tarix, hadisə, rəvayət.
Qonuşmaq – söhbət etmək, danışmaq.
Haya – günah işlərdən qorunmaq.
Həmra- qırmızı, qızıl.
Hoşnut- razı, məmnun.
Hükəma – müdriklər.
Iftihar - fəxr, öyünmə, güvənc.
Irfan – mədəniyyət, bilik; idrak, maarif.
Ixtifa - gizlətmə, örtünmə.
Ixtilat - qaynayıb-qarışmaq, görüşmək.



Ittifaq – birlikdə iş görmək, birləşmək.
Kəsalət – kefsizlik, yorğunluq.
Kəsif – natəmiz, pinti.
Libas – geyim, paltar, libas.
Madam – evli avropalı qadın.
Mahrəm – şəriətin yasaq etdiyi şey, haram.
Məslək – yol, əqidə.
Məzur – üzürlü, səbəbli.
Mövla – sahib, yiyə, ağa.
Mürtədd- dönük, dinsiz
Mürşüd – yol göstərən.
Namdar (f)- adlı-sanlı, igid, qəhrəman
Namərbuta - əlaqəsiz,rabitəsiz; qabiliyyətsiz.
Naşir – yayan, səpən; nəşr edən.
Nəfx - peyğəmbərin ölüləri dirildən nəfəsi (dini); şişkinlik; musiqi alətlərini çalan.
Nəşat – şadlıq, sevinc.
Omuz – çiyin, arxa.
Orman –meşə, balaca meşə.
Rüzədar - oruc tutan.
Rövzəxan – mərsiyə oxuyan.
Sərkar – başçı, böyük, cənab.
Səhih – gerçək, doğru, əsil.
Soqat – küçə.
Sur - toy, qonaqlıq.
Təhrirat – rəsmi kağızlar, rəsmi yazılar.
Təkzib – yalana çıxarma.
Təfəl – günəşin şıxması, ilk, dan; uşaqlıq.
Təkdir – bulandırmaq; əziyyət vermək.

Təkəffül – zamın olmaq.
Təkfir –kafirlikdə təqsirləndirmə.
Təsxir - ələ keçirmək, məftun etmək.
Təht – idarəsi altında, tabeçiliyində.

Qeyd: "Lək-lək" məcmuəsinin transliterasiyasınra birinci nömrəsində yalnız redaksiyanın ünvanı, məramı və elanı barədə yazılanlar verilmiş, bunlar bütün nömrələrə də aid olduğundan təkrarçılıq aradan qaldırılmışdır. Üz qabığında XIX əsrə aid olan İrəvan şəhərindəki Göy məscidin, İrəvan rus müsəlman qız məktəbinin və jurnılın üz qabığınnın şəkilləri verilmişdir.

***Tərtibçi müəllif.***



**İrəvan türklərinin ədəbi mətbuat abidəsi**
**"LƏK-LƏK" jurnalı.**
**Bakı, 2008.**

Nəşriyyat direktoru: **Sahib Əliyev**
Transliterasiya edən: **Ziyəddin Məhərrəmov**
Kompüterdə yığanı
və tərtibçisi: **Ruhiyyə Məhərrəmli**
Korrektoru: **İlhamə Məhərrəmova**

